## GÜNAHLARA BİGANƏLİYİN TƏHLÜKƏSİ

Allah mənə və sənə mərhəmət eləsin, möhtərəm oxucu, bil ki, izzət və cəlal sahibi Allah öz bəndələrinə tam səmimiyyətlə tövbəni vacib bilmiş və buyurur: **"Siz ey iman gətirmişlər! Allaha tam səmimiyyətlə tövbə edin!"** (ət-Təhrim, 8).

Kəramət sahibi olan katiblər yazını başlayana qədər Allah-təala bizə tövbə üçün möhlət verir. Peyğəmbər (s.a.v.) buyurur: *"Sol tərəfindəki mələk qələmi qaldırıb altı saat*[1] *xəta edən müsəlman bəndə üçün əlində saxlayır. Bəndə peşman olub bağışlanma diləsə, o, qələmi kənara qoyur. Əks halda hər bir hadisəni qələmə alır"*[2]. Yazıdan sonra əcəl çatana qədər də yeni bir möhlət verilir.

Bu gün adamların çoxunun faciəsi bundadır ki, onlar təkəbbür göstərib Allahdan bağışlanma istəmirlər, gecə-gündüz müxtəlif növ günahlara yol verirlər. Onlardan bəziləri öz günahlarını kiçiltmək bəlasına düçar olurlar. Görürsən ki, biri özlüyündə kiçik günahlara nifrət etsə də deyir: "Bir baxış, yaxud qadınla[3] əllə görüşməyin nə zərəri ola bilər?".

Bunlar jurnallarda və kino-filmlərdə gözlərini naməhrəmlərə dikir, bəziləri bu işin haram edildiyini bilə-bilə ona yol verir.

Bu nə qədər pis bir işdir? Bu günah böyükdür, yoxsa kiçik? Belə bir hadisənin şahidi olsan, onları İmam əl-Buxarinin (Allah rəhmət eləsin) "Səhih" əsərindən götürülmüş iki deyimin məzmunu ilə müqayisə et:

1) Ənəs (Allah ondan razı olsun!) demişdir: "Siz bilməlisiniz ki, əməllər sizin gözünüzdə tükdən də incədirlər. Allah peyğəmbərinin (s.a.v.) dövründə biz onların gətirə biləcəyi aqibəti hesaba alırdıq".

2) İbn Məsud (Allah ondan razı olsun!) demişdir: "Mömin öz günahlarını elə görür ki, elə bil o, dağın altında onun uçulacağından qorxa-qorxa oturmuşdur. Abırsız günahkar üçünsə günahları bir milçək kimidir, burnunun ucundan vızıltı ilə uçub keçir, o isə əli ilə onu qovur".

3) Bu adamlar Peyğəmbərin (s.a.v.) aşağıdakı hədisini oxuduqda indi bu işin nə qədər təhlükəli olmasını nəzərə alırlarmı? Peyğəmbər (s.a.v.) buyurur: *"Siz və öz günahlarına biganə qalanlar. Öz günahlarına biganə qalanlar vadinin dibində yaşayan tayfa kimidir. Hərə çöp boyda bir günahla gəlsə, onları yığıb öz yeməklərini bişirirlər. Günah ona biganə qalan günahkarı məhv edir". Bu hədisin başqa bir rəvayətində deyilir: "Siz və günahlarına biganə qalanlar. Günahlar*

---

[1] Çox güman ki, bu halda məlum astronomik saat nəzərdə tutulur ki, bu bir gecə və ya gündüz qədərdir.

[2] Ət-Təbərani "əl-Kəbir", əl-Beyhəqqi "Şüabül İman" və əl-Əlbani "Silsilətül əhadis səhihə" 1209.

[3] Bu halda əcnəbi dedikdə məhrəm olmayanlar nəzərdə tutulur.

*sahiblərinin başının üstünü alıb onları məhv edirlər"*[4].

4) Alimlər qeyd etmişlər ki, həyanın azlığı, biganəlik və Allahdan qorxmamaqdan doğan kiçik günah biganəlik üzündən böyük günah dərəcəsinə çatır, ona əlavə edilməsə də. Buna görə israr və inadkarlıq olan yerdə kiçik günah olmaz, bağışlanma dilənən yerdəsə böyük günah olmaz.

Bu halda olan şəxslərə üz tutub deyirik: Günahın kiçikliyinə baxma, kimin günaha yol verdiyinə bax.

İnşaallah, günah etdiklərini, təqsirkar olduqlarını hiss edən, özünü itirməyib batil əməldə israr etməyən sadiq adamlar bu sözlərdən faydalanacaqlar.

Bu sözlər Allahın aşağıdakı buyuruğuna iman gətirənlər üçündür: **"Ya Məhəmməd! Qullarıma xəbər ver ki, tövbə edəcəkləri təqdirdə Mən, həqiqətən, bağışlayan və rəhm edənəm! Eyni zamanda əzabım da çox şiddətli əzabdır!"** (əl-Hicr, 49-50).

## TÖVBƏNİN ŞƏRTLƏRİ VƏ TAMAMLAYICILARI

Tövbə böyük sözdür, dərin mənaları vardır. Bu heç də bəzilərinin düşündüyü kimi dildə deyib əməldə günah işlətməyə davam etmək deyildir. Allah-təalanın bu kəlamı barədə dərindən düşünmək lazımdır: **"Rəbbinizdən bağışlanma diləyin, sonra Ona tövbə edin!"** (Hud, 3). Göründüyü kimi tövbə istiğfarə (bağışlanma diləməyə-tərc.) əlavə olan bir işdir.

Hər bir əzəmətli, böyük iş kimi tövbənin də öz şərtləri vardır. Alimlər tövbənin Qurani-kərimdən və hədislərdən əxz etmiş olduqları şərtlərini müəyyənləşdirmişlər. Bunlardan bəziləri aşağıdakı kimidir:

Birinci: Dərhal günahdan əl çəkmək.

İkinci: Ötüb keçənlər barədə peşmançılıq hissi.

Üçüncü: Günahı bir daha təkrar etməmək əzmi.

Dördüncü: Günah üzündən zülmə məruz qalanların hüquqlarını bərpa etmək və ya onlardan bəraət tələb etmək.

Alimlər həmçinin səmimi tövbənin başqa incəliklərini də qeyd etmişlər. Bunları bəzi misallarla birlikdə göstərək:

**Birinci**: Günahdan əl çəkmək başqa heç bir şeyə görə deyil, yalnız Allahın xatirinə olmalıdır. Beləki günah işi görmək qüdrətinə malik olmamağa, onu bir daha təkrar etməyi bacarmamağa və yaxud adamların söz-söhbətindən qorxuya görə ondan əl çəkmək düzgün deyildir.

İnsanlar arasında hörmət və nüfuzunu itirmək və yaxud vəzifədən qovulmaq qorxusundan tövbə edənin tövbəsi də qəbul deyildir.

Öz səhhəti və gücünü itirmək qorxusundan edilən tövbə də hesaba

---

[4] Əhməd. Səhihül cəmii 2686-2687.

alınmır. Məsələn, birisinin zöhrəvi xəstəliklərin və ya fiziki qüvvəsini və yaddaşını itirmək qorxusundan zinakarlıqdan və ya fahişəlikdən əl çəkməsi buna aiddir.

Evə giriş tapa bilmədiyi, seyfi aça bilmədiyi üçün və yaxud gözətçi və polisin qorxusundan oğurluqdan əl çəkən də tövbə etmiş hesab edilməz.

Məsələn, tutaq ki, birisi rüşvət verən adamın korrupsiya ilə mübarizə idarəsindən ola biləcəyindən qorxaraq rüşvət almır. Bu heç də tövbə demək deyildir.

Müflisləşmək qorxusundan şərab içməkdən və narkotik maddələr qəbul etməkdən əl çəkməyi də tövbə hesab etmək olmaz.

Həmçinin iradəsindən asılı olmayan bir işi görə bilməyən adamın günah işlədə bilməməsi də tövbə deyildir. Beləki, yalançının nitq qabiliyyətini itirdiyinə görə yalan danışmaqdan əl çəkməsi heç də tövbə deyildir. Habelə zinakarın alçaq əmələ yol vermək qüdrətini itirməsinə və ya oğrunun qəzaya uğrayıb əl və ayaqlarından məhrum olmasına görə günah iş tuta bilməməsi tövbə ola bilməz.

Bunun üçün peşmançılıq, asilik arzusundan əl çəkmək və ya olub keçənlərə təəssüf hissi keçirmək lazımdır. Məhz bu hala Peyğəmbərin (s.a.v.) *"Peşmançılıq tövbə deməkdir"*[5] sözləri aiddir.

Dilinə günah olanı gətirən adamı Allah-təala onu edən səviyyəsinə endirmiş olur. Bax, gör, Peyğəmbər (s.a.v.) bu barədə nə demişdir: "Dünya dörd adam üçündür: Allahın mal və elm bəxş etmiş olduğu, Rəbbindən qorxan, bununla da Onun mərhəmətinə çatan bəndə. Allah onun timsalında haqqı nümayiş etdirir. Belə adam ən yaxşı mövqedədir. Allahın elm verdiyi, lakin var-dövlət bəxş etmədiyi bəndə. Beləsi saf niyyətli olur və deyir: Əgər mal-dövlətim olsaydı, filan işi görərdim, o da xoş niyyət sahibidir. Hər ikisinin əcri eynidir. Allahın mal-dövlət bəxş etdiyi, lakin elm vermədiyi bəndə. Bu adam bilməməzlik üzündən var-dövlətini ayaq altına atır, Allahdan da qorxmur. Onun mərhəmətini qazanmır. Bilmir ki, Allahının onun üzərində haqqı vardır. Belə adam ən pis bir mövqe sahibidir. Allahın nə elm, nə də mal-dövlət verdiyi bəndə. O deyir: Əgər var-dövlətim olsaydı, filan işi görərdim. Onun da niyyəti saf deyildir. Bu son iki nəfərin günahı eynidir"[6].

İkinci: Günahın qəbahətini və zərərini unutmaq istəmədən tövbə etməzlər. Bu o deməkdir ki, həqiqi tövbə keçmiş günah yada düşəndə, ləzzət və sevinc hissi duymaq və ya gələcəkdə bir daha ona qayıtmaq istəyi ilə bir araya sığmaz.

Mərhum İbn əl-Qiyəm "Dərd və dərman" və "Faydalar" adlı əsərlərində günahın çoxsaylı zərərlərini göstərir. Onlardan bəzilərini qeyd edək:

Elmdən məhrum olmaq, qəlbdə tənhalıq və narahatlıq hissi keçirmək,

---

[5] Əhməd və İbn Macənin rəvayəti. Səhihül camii-6802.

[6] Əhməd və ət-Tirmizi. Səhihül tərğib və t. Tərhib 1/9.

işlərin düyünə düşməsi, zəiflik, xeyir-bərəkətin götürülməsi, uğursuzluq, təngnəfəs olmaq, pisliklərin meydana gəlməsi, günah işlərə qurşanmaq, günahı Allah və insanlar üçün əhəmiyyətsiz hesab etmək, heyvanların lənəti, murdar paltar geymək, qəlbən günaha meyl edib lənətlənməyə layiq olmaq, duanın qəbul edilməsinə mane olmaq, quruda və dənizdə fitnə-fəsad törədib qeyrəti, həyanı itirmək, nemətlərdən məhrumiyyət, asi qəlbin qorxu keçirməsi, şeytanın əsirinə çevrilmək, pis sonluq və axirət əzabı.

Günahın zərərlərini bilmək bəndəyə bütünlüklə onlardan uzaqlaşmaq imkanı verir. Bununla belə bəziləri bir günahdan əl çəkib aşağıdakı səbəblərdən yeni bir günaha qurşanırlar:

1-Günahın məsuliyyətinin yüngül olmasının zənn edilməsi,

2-Nəfsin daha çox günaha mail olması, ehtiras və şəhvət hisslərinin güclənməsi,

3-Günaha yol vermək şəraitinin başqasından, səbəbləri hələ mövcud olmayan və hazırlanmağa möhtac olan günahdan daha əlverişli olması,

4-Yaxınlarının, qohum-əqrabanın günah işlərə bağlılığı üzündən insanın özünün də onlardan əl çəkə bilməməsi,

5-Günah işin bir adam üçün şan-şöhrət, dostlar arasında mövqe qazanmaq üçün vasitə olması. Bu mövqeyi itirmək qorxusu adamı asilikdə israr etməyə məcbur edir. Ayrı-ayrı quldur dəstələrin başçıları, şər, fitnə-fəsad törədənlər bu cür günaha batırlar. Məsələn şair Əbu Nüvas başqa bir vaiz şair Əbu Ətahiyyənin ona və anasına verdiyi nəsihət sayəsində günaha batmışdır. Əbu Nüvas belə deyir: "Ey Ətahiyyə, o əyləncələrdən əl çəkməyimi heç görmüsənmi? Tayfa içində şöhrətimi qoyub İman fəsad toxumu səpməyimi heç görmüsənmi?"

**Üçüncü**: Bəndə tövbə etməyə tələsməlidir. Çünki tövbənin gecikdirilməsinin özü də günahdır və yeni bir tövbəyə möhtacdır.

**Dördüncü**: Tövbənin nöqsanlı olmasından qorxmaq. Adam tövbəsinin mütləq qəbul edildiyinə arxayın olmamalıdır, özünə inanmalı və özünü Allahın nifrətindən sığorta etməlidir.

**Beşinci**: Allahın itirilmiş haqqını başa düşmək. Məsələn, imkan varsa əvvəllər mümkün olmamış, zəkat ayırmaq, həmçinin kasıblara vacib olan yardımları etmək kimi işləri yerinə yetirmək.

**Altıncı**: Asilik olan yeri tərk etmək. Beləki bu yerdə olmaq adamı bir daha günaha sürükləyir.

**Yeddinci**: Asilikdə yardımçı olan adamdan ayrılmaq. (Bu və bundan əvvəlki bəndə aid aşağıda bir hədis veriləcəkdir).

Allah-təala buyurur: **"Möminlərdən başqa bütün dostlar həmən gün bir-birinə düşmən olacaqlar"** (əz-Züxruf, 67). Qiyamət günü pis işlərdə həmkar olanlar bir-birini lənətləyəcəkdir. Buna görə də sən, ey tövbə edən, bu cür adamlardan uzaqlaşmalı, onlarla aranı kəsməli, onları tərk etməli və özünü

onlardan qorumalısan. Onların çağırışları qarşısında acizlik göstərsən, şeytan sənə yoldaş olar, bu çağırışlara uyub yenidən onlara qoşularsan. Bilirsən ki, zəifsən, müqavimət göstərə bilmirsən.

Ayrı-ayrı fərdlərin keçmiş dostlarla əlaqələri bərpa edib günah işlərə qayıtması halları çoxdur.

**Səkkizinci**: Malik olduğu haram şeyləri məhv etmək. Bura spirtli içkilər, ud, zurna və klarnet kimi musiqi alətləri, haram kino-filmlər, abırsız roman və hekayələr, heykəllər daxildir. Belə şeyləri sındırmaq, məhv etmək və ya yandırmaq vacibdir.

**Haqq** yolunun başlanğıcında bütün nadanlıq libasının atılması məsələsi də həll edilməlidir. Neçə-neçə hekayədə tövbə edənlərin haram paltarda qalmasının onların uğursuzluğunun, tövbədən geri çəkilib hüda yolundan çıxıb azmasının səbəbi olması barədə danışılır. Allahdan səbat diləyirik.

**Doqquzuncu**: Özünə əməli-saleh yoldaşlar, köməkçilər seçmək. Bunlar pis yoldaşları əvəz edir, zikr etmək, elm məclislərində iştirak kimi işlərlə məşğul olur, boş vaxtlarını faydalı şeylərə sərf edir və bununla da şeytana keçmişi onların yadına salmaq imkanı vermirlər.

**Onuncu**: Öz orqanizminə arxalanmaq. Adam öz bədənini yetişdirir ki, onun enerjisini Allaha itaət yolunda sərf etsin. Halallığa bağlı qalır ki, təmiz ətə və qana malik olsun.

**On birinci**: Tövbə xırıltıya qədər, günəş Qərbdən çıxmamışdan qabaq baş verməlidir. Xırıltı ruh bədəni tərk edənə qədər boğazdan çıxan son səsdir. Məqsəd tövbənin kiçik və böyük qiyamətdən qabaq baş verməsidir. Peyğəmbər (s.a.v.) bu barədə buyurur: *"Canını tapşırmazdan qabaq edilən tövbə qəbul edilir"*[7]. Həmçinin: *"Günəş Qərbdən çıxana qədər tövbə edənin tövbəsini Allah qəbul edər"*[8].

## BÖYÜK TÖVBƏ

Burada Peyğəmbərin (s.a.v.) əshabələri olan ilk dəstənin üzvlərinin tövbəsindən nümunələr verəcəyik.

Bəridənin (Allah ondan razı olsun!) hədisi: *"Maiz ibn Malik əl-Əsləmi Allah peyğəmbərinin (s.a.v.) yanına gəlib deyir:*

*-Ya Rəsulullah! Özümə zülm edib zina etmişəm, istəyirəm ki, məni pak edəsən.*

*Peyğəmbər (s.a.v.) onu rədd etdi. Səhəri yenə gəlib dedi:*

*-Ya Rəsulullah! Zina etmişəm....*

*İkinci dəfə onu qovdu. Bundan sonra Peyğəmbər (s.a.v.) bir nəfəri onun*

---

[7] ƏHməd və ət-Tirmizi. Səhihul camii 6132.

[8] Müslim.

*qəbiləsinə göndərib soruşdu:*

*-Onun ağlında bir naqislikdən xəbəriniz var? Onda xoşa gəlməyən nəsə vardırmı?*

*Dedilər:*

*-Onun ağıllı adam kimi tanıyırıq. Bildiyimizə görə, əməli-saleh adamlardandır.*

*Maiz üçüncü dəfə gəldi. Yenə Peyğəmbər (s.a.v.) bir adam göndərdi ki, onun barədə soruşsun. Soruşdu, bildi ki, nə özü, nə də ağlı barədə pis bir şey yoxdur.*

*Dördüncü dəfə gələndə bir çala qazdırdı. Əmr etdi ki, onu daşqalaq etsinlər".*

*Bəridə həmçinin deyir: "Qamidiyyəli bir qadın gəlib deyir:*

*-Ya Rəsulullah! Zina etmişəm. Məni pak et. Onu da Peyğəmbər (s.a.v.) rədd etdi. Səhəri yenə gəldi və dedi:*

*-Ya Rəsulullah! Niyə məni qovursan? Ola bilsin məni də Maiz kimi qovasan, Allaha and olsun, mən hamiləyəm.*

*Peyğəmbər (s.a.v.) dedi:*

*-Get, doğ.*

*Doğandan sonra qucağında uşaq gəlib dedi:*

*-Budur, artıq doğmuşam.*

*Peyğəmbər (s.a.v.) ona dedi:*

*-Get uşağını əmizdir. Döşdən ayrılandan sonra gələrsən.*

*Qadın getdi. Uşaq döşdən ayrılandan sonra əlində çörək parçası ilə gəldi. Qadın dedi:*

*-Ya Rəsulullah! Döşdən ayırdım. Uşaq artıq yemək yeyir.*

*Peyğəmbər (s.a.v.) uşağı müsəlmanlardan birinə verib qadın üçün döşünə qədər bir çala qazıtdırdı. Onu çalaya salıb daş-qalaq etməyi əmr etdi. Xalid ibn əl-Valid qadını daşlayanda qan onun üzünə sıçradıqda onu söydü. Peyğəmbər (s.a.v.) ona dedi:*

*-Yavaş, Xalid! Allaha and olsun, o tövbə etdi. Əcr sahibi onun tövbəsini qəbul etdi və onu bağışladı.*

*Sonra cənazə namazı qılıb qadını dəfn etdirdi"*[9].

*Başqa bir rəvayət: "Ömər soruşur:*

*-Ya Rəsulullah. Onu daşa basdırdın, sonra namaz qıldın. Peyğəmbər deyir:*

*-O elə bir tövbə etdi ki, onu şəhər əhalisinin yetmiş nəfəri arasında bölsən belə onlara çatar. İzzət və cəlal sahibi Allah üçün öz nəfsini təmizləməkdən də yaxşı bir şey varmı"*[10].

---

[9] Müslim.

[10] Əbdürrəzzaqın rəvayətidir.

## TÖVBƏ ÖZÜNDƏN ƏVVƏL OLANLARI SİLİB TƏMİZLƏYİR

Birisi deyir: Tövbə etmək istəyirəm. Lakin, kim zəmanət verir ki, Allah məni bağışlayar. Tutaq ki, tövbə etdim və doğru yola gəldim. Lakin tərəddüd hissi məni rahat qoymur. Bilsəydim ki, Allah məni bağışlayar, tövbə edərdim?!

Bu adama deyirəm ki, sənin keçirtdiyin hissləri sənə qədər Allah peyğəmbərinin (s.a.v.) əshabələri də yaşamışlar.

Aşağıda verilən iki rəvayətin məzmunu barədə dərindən düşünsən, Allahın köməyilə nəfsində olanlar ötüb keçəcəklər.

**Birinci**: Mərhum İmam Müslim Əmr ibn əl-Asın (Allah ondan razı olsun!) müsəlman olması hekayəsini verir: *"Allah-təala İslamı qəlbimə yerləşdirdikdən sonra Peyğəmbərin (s.a.v.) yanına gəlib dedim:*

*-Sağ əlini mənə ver, sənə beyət edim.*

Peyğəmbər (s) sağ əlini uzadıb əlini tutdu və dedi:

*-Sənə nə olub, ya Əmr?*

*Dedim ki, şərt qoymaq istəyirəm. Soruşdu:*

*-Nəyə şərt qoymaq istəyirsən?*

*Dedim ki, məni bağışlasın. Dedi:*

-Ya Əmr, bilmirsən ki, İslam özündən əvvəl olanları ləğv edir. Hicrət özündən əvvəl olanları ləğv edir. Həcc özündən əvvəl olanları ləğv edir".

**İkinci**: İmam Müslim ibn Abbasın (r) bu rəvayətini verir*:*

*"Şirk əhli olan bir dəstə adam çox qətllərə yol verdilər, çox zinalar etdilər və sonra Məhəmməd peyğəmbərin (s) yanına gəlib dedilər:*

*-Sənin dəvət etdiyin və dediklərin yaxşıdır. Bizə desən, biz kəffarət edərik.*

*Bu zaman Allahın aşağıdakı kəlamı nazil oldu*: **"Allaha başqa bir tanrını şərik kimi qəbul etməyənlər, haqsız yerə Allahın haram bildiyi adam öldürməyən-lər və zina etməyənlər. Bütün bunları edənlərsə günaha layiqdirlər"** (əl-Furqan, 68). Həmçinin bu ayə nazil oldu: **"Ya Peyğəmbər! Özlərinə zülm etməkdə ifrata varanlara de ki, Allahın mərhəmətindən ümidsiz olmasınlar. Allah bütün günahları bağışlayandır. Həqiqətən, O, bağışlayan və mərhəmət edəndir!"** (əz-Zumər, 53).

## ALLAH MƏNİ BAĞIŞLAYARMI?

Deyirsən ki, tövbə etmək istəyirəm, amma günahlarım həddən artıq çoxdur. Sənin təsəvvürünə gətirə biləcəyim və ya bilməyəcəyim elə bir abırsızlıq yoxdur ki, onu etməyim. Özü də o dərəcədə bilmirəm ki, Allah uzun illər ərzində etdiklərimə görə məni bağışlaya bilərmi?!

Hörmətli qardaşım, sənə bunları deyirəm:

Bu təkcə sənin yox, tövbə etmək istəyən çox adamın problemidir. Bir misal gətirim sənə: Bir dəfə bir gənc mənə danışdı ki, uşaq yaşlarından günah işlərə qurşanmışdır, on yeddi yaşına çatanda müxtəlif növlərdə olan və ən müxtəlif adamlarla həyata keçirilən həm böyüklü, həm də kiçikli çoxsaylı günahlardan ibarət uzun bir siyahıya malik olmuşdur. Bir dəfə hətta körpə bir qıza da təcavüz etmiş, çoxsaylı oğurluqlara yol vermişdir. Gənc deyir: İzzət və Cəlal sahibi Allaha tövbə etdim. Yuxudan dururam, gecəni ibadətlə keçirirəm, bazar ertəsi və cümə axşamı oruc tuturam, fəcr namazından sonra Qurani-kərimi oxuyuram. Mənim tövbəm qəbuldurmu?

Bir müsəlman olaraq prinsipimiz belədir ki, bizdən müəyyən məsələ barədə hökm vermək, həll və əlac aramaq istədildikdə biz Kitab və Sünnəyə müraciət etməliyik. Kitaba müraciət etsək, Allah-təalanın bu mübarək kəlamına rast gələcəyik: **"Ya Peyğəmbər! Özlərinə zülm etməkdə ifrata varanlara de ki, Allahın mərhəmətindən ümidsiz olmasınlar. Allah bütün günahları bağışlayandır. Həqiqətən, O, bağışlayan və mərhəmət edəndir. Rəbbinizə tövbə edin və təslim olun!"** (əz-Zumər, 53-54).

Göstərilən problemə dəqiq cavab budur. O çox aydındır və əlavə şərhə ehtiyacı yoxdur. Günahların Allahın onları bağışlaya biləcəyindən artıq dərəcədə çox olması təsəvvürü:

**Birinci**: Rəbbimizin mərhəmət ölçüsü barədə bəndənin biliyinin yəqin olmamasından;

**İkinci**: Allahın bütün günahları bağışlamaq qüdrətinə inamın nöqsanlı olmasından;

**Üçüncü:** Qəlbin ən mühüm əməllərindən biri olan rica etmək əməlinin zəifliyindən;

**Dördüncü**: Günahların silinməsində tövbənin rolunu düzgün qiymətləndirməməkdən irəli gəlir.

Bu bəndlərin hər birini izah edək:

**Birinci** bəndə aid bunu deyək: Bu məsələni aydınlaşdırmaqda Allah-təalanın aşağıdakı kəlamı kifayətdir: **"Mənim mərhəmətim hər şeyi əhatə edir"** (əl-Əraf, 56).

**İkinci** barədə: Aşağıdakı səhih hədis vardır: *"Allah-təala buyurur ki, Mənim günahları bağışlamaq qüdrətinə malik olmağımı bilən şəxsin günahlarını bağışlayıram: bu Mənim üçün heç nədir, əgər Mənə şərik qoşmursa"*[11]. Bu, axirətdə bəndənin Rəbbilə görüş vaxtına aiddir.

**Üçüncü** bəndin məzmununu bu əzəmətli hədis aydınlaşdırır: *"Ey Adəm övladı! Məni çağırsan və rica etsən, səni bağışlaram, bu mənim üçün heç nədir. Ey adəm övladı! Sənin günahların səmalar qədər olsa belə, sən Məndən*

[11] Ət-Təbarəni, əl-Hakim. Səhihül Camii 4330.

*bağışlanma diləsən, səni bağışlaram, bu mənim üçün heç nədir, Ey adəm övladı! Sən yanıma yer boyda günahlarla gəlsən, Mənimlə görüşə Mənə şərik qoşmadan gəlsən, bir o qədər məğfirətlə səni bağışlaram"*[12].

**Dördüncü** bəndi izah edən hədis: Peyğəmbər (s.a.v.) buyurur: "Günahını tövbə edən, heç günah etməyən kimidir"[13].

Çoxsaylı günah sahibi olub Allahın onu bağışlayacağını çətin hesab edənlərə aşağıdakı hədisi misal gətirək.

**Yüz nəfəri öldürənin tövbəsi.** Əbu Səid Səd ibn Malik ibn Sinan əl-Xüdri (Allah ondan razı olsun!) rəvayət edir ki, Peyğəmbər (s.a.v.) bu hədisi danışmışdır: *"Keçmiş zamanda bir kişi varmış. Onun qətlə yetirdiyi adamların sayı doxsan doqquza çatmışdı. O, yer üzünün ən bilikli adamı barədə soruşanda ona bir rahibi nişan verirlər. Qatil onun yanına gəlib deyir ki, doxsan doqquz nəfər öldürmüşdür, tövbəsi qəbul olarmı? Rahib ona deyir ki, yox, olmaz. Qatil onu da qətlə yetirir və yüzü tamamlayır. Yenə də dünyanın ən bilikli adamı barədə soruşur, gəlib ona deyir ki, yüz adam öldürmüşdür, tövbə edə bilərmi? Alim deyir ki, bəli, olar. Ona mane olan səbəb barədə deyir ki, elə bir yerə get ki, orada insanlar Allaha ibadət etsinlər. Sən də ibadətə qoşul və Allaha ibadət et. Öz vətəninə qayıtma, ora pis yerdir. Kişi yola düşdü, yolun yarısına çatanda ölüm onu haqladı, mərhəmət mələkləri və ölüm mələkləri onun barədə mübahisə etdilər. Mərhəmət mələkləri dedilər ki, Allah-təalaya qəlbən tövbə edərək gəlmişdir. Əzab mələklərisə dedilər ki, o qətiyyən xeyir iş görməmişdir. Bir mələk adam simasında nazil olub onlar arasında hökm verdi və dedi ki, iki yer arasındakı məsafəni ölçün, görün, kişi hansına daha çox yaxınlaşmışdır. Ölçdülər və gördülər ki, kişi daha çox getmək istədiyi yerə yaxındır. Mərhəmət mələkləri onu özlərilə apardılar"*[14]. Səhih hədis toplusundakı rəvayətdə deyilir: *"Əməlisaleh adamların yaşadığı kəndə bir qarış artıq yaxınlaşmışdı və onun sakinlərindən oldu"*. Səhih olan başqa rəvayətdə deyilir: *"Allah birinə vəhy etdi ki, uzaqlaşdırsınlar, o birinə vəhy etdi ki, yaxınlaşdırsınlar. Arada olan məsafəni ölçsünlər. Onun filan yerə bir qarış artıq yaxınlaşdığını görüb onu bağışladı"*. Bəli, onun tövbəsinə mane olan səbəb! İndi, ey tövbə etmək istəyən, məgər, sənin günahların Allahın tövbəsini qəbul etdiyi adamınkından daha çoxdur? Bu bədbinlik nə üçündür? Əslində məsələ bundan qat-qat böyükdür, ey müsəlman qardaş! Allah-təalanın bu kəlamı barədə dərindən düşün: "**Allaha başqa bir tanrını şərik kimi qəbul etməyənlər, haqsız yerə Allahın haram bildiyi adam öldürməyənlər və zina etməyənlər. Bütün bunları edənlərsə günaha layiqdirlər. Qiyamət günü onların əzabı qat-qat artar, əzab içində zəlil olaraq qalarlar. Lakin kim tövbə etsə, iman gətirsə və saleh əməllər etsə, onların qəbahətlərini Allah yaxşılıqla əvəz edər. Allah bağışlayan və**

---

[12] Ət-Tirmizi. Səhihül Camii 4338.

[13] İbn Macə. Səhihül Camii 3008.

[14] Hamılıqla məqbul hədisdir.

**rəhm edəndir!”** (əl-Furqan, 68-70). Allahın daha bir mübarək kəlamı: **“O şəxslər ki, Allah onların qəbahətlərini yaxşılıqla əvəz edir”** (əl-Furqan, 70).

Əvəzetmə bu halda iki növdədir:

**Birinci**: Pis keyfiyyətlərin, sifətlərin yaxşıları ilə əvəz edilməsi. Belə ki, adamların şirkini imanla, zinakarlığı mətanət və dəyanətlə, yalanı doğruluqla, xəyanəti etibarla və i.a. əvəz edilir.

**İkinci**: Qiyamət günündə qəbahətlərin yaxşılıqlarla əvəz edilməsi. Allah-təalanın bu kəlamı barədə dərindən düşün: **“Allah... onların qəbahətlərini Allah yaxşılıqla əvəz edər”**. Əlbəttə, deyilmir ki, hər bir pislik yaxşılıqla əvəz edilir. Bu əvəzetmədə biri digərindən kəmiyyət və keyfiyyət baxımından az, bərabər və ya çox da ola bilər. Bu, tövbə edənin səmimiliyindən, tövbənin kamilliyindən asılıdır. Görəsən bundan da böyük bir kəramət varmı? Bu ilahi kəramətin aşağıdakı gözəl hədisdə verilən şərhinə bax:

Əbdürrəhman ibn Cübeyr Əbu Təvil Şətib əl-Məmdudə istinadən rəvayət edir: “Bir gün o, Peyğəmbərin (s.a.v.) yanına gəlib deyir: (Başqa rəvayətdə deyilir ki, çox yaşlı, baş örtüyü gözlərinin üstünə düşmüş bir qoca əlindəki əsaya söykənə-söykənə Peyğəmbərin (s.a.v.) hüzuruna gəlib deyir):

-Elə bir adam tanıyırsanmı bütün günahların sahibidir, heç nə qoymamışdır, nə böyük, nə də kiçik günah varsa, hamısını etmişdir. (Başqa rəvayətdə deyilir ki, sağ əli dəfələrlə andını pozmuşdur, onu tutub kəsmişlər, çox adam həlak etmişdir). Belə adamın tövbəsi qəbul edilərmi?

*Peyğəmbər (s.a.v.) soruşur:*

*-Müsəlman olmusanmı?*

*Kişi deyir:*

*-Mən Allahdan başqa ibadət haqqı olan tanrının olmamasına və sənin də Allahın rəsulu olmağına şəhadət verirəm.*

*Allah peyğəmbəri (s.a.v.) deyir:*

*-Xeyir işlər gör, pisliklərdən əl çək. Onların hamısını Allah xeyirlə əvəz edəcəkdir.*

*Kişi soruşur:*

*-Xəyanətlərimi, abırsızlıqlarımı da?!*

*Peyğəmbər (s.a.v.) deyir bəli.*

*Kişi deyir:*

*-Allahu əkbər! Gözdən itənə qədər bunu deyirdi”*[15].

Görürsən ki, tövbə edən deyir: Mən yol azmışdım, namaz qılmırdım, İslamdan xaric olmuşdum. Amma bəzi yaxşı işlər də görmüşəm, bunlar tövbədən sonra hesaba alınarmı, yoxsa puç olub gedər?

---

[15] Əl-Heysəmi deyir ki, bu hədisi ət-Təbərani, əl-Bəzzar və onun şagirdləri rəvayət etmişlər. (Bax: əl-Mücəmmə 1/34). Əl-Münziri deyir ki, yaxşı və güclü hədisdir (ət-Tərcib). İbn Həcərə görə səhihdir. (əl-İsabə: 4/149).

Cavab belədir: Ürvə ibn Zübeyr Həkim ibn Hizama əsasən bu hədisi verir: *"O, Allah peyğəmbərindən (s.a.v.) soruşur:*

*-Ey Allah elçisi! Cahiliyyə dövründə etdiyim sədəqə vermək, qul azad etmək, qohumluğu qorumaq kimi əməllər üçün, görəsən mənə əcr çatırmı?*

*Allah peyğəmbəri (s.a.v.) deyir:*

*-Sən öz bütün keçmiş xeyirxah əməllərinlə birlikdə müsəlman olmusan"*[16].

Bu günahlar bağışlanır, o pisliklər yaxşılıqla əvəz edilir, Cahiliyyə dövrünün yaxşı işləri də hesaba alınır. Bəs yerdə nə qalır?!

## GÜNAHA BATSAM, NƏ ETMƏLİYƏM?

Demək istəyirsən ki, günah iş görsəm, necə bir-başa tövbə etməliyəm? Günahdan sonra dərhal tövbə etmək üçün hansı işləri görməliyəm?

**Cavab**: Günah əməldən əl çəkəndən sonra bu iki işi mütləq görmək vacibdir:

**Birinci**: Qəlbin işilə, yəni peşman olmalı, bir daha bu əmələ yol verməmək qərarına gəlməli. Bunlar Allahdan qorxu nəticəsində baş verir.

**İkinci**: Əməli işlə, yəni müxtəlif xeyir işlər görmək. O cümlədən aşağıda mətni verilən tövbə namazını qılmaq:

Əbu Bəkrin (Allah ondan razı olsun!) rəvayəti: "Peyğəmbərin (s.a.v.) bunları deməsini eşitmişəm:

- Hər hansı bir günah iş tutan adam təmizlənir, iki rükət namaz qılır, bağışlanma diləyir və Allah onu bağışlayır[17]. Sonra bu ayəni oxudu: **"O şəxslər ki, günah işlədir və özlərinə zülm edirlər, amma Allahı yada salıb etdikləri günahlar müqabilində bağışlanma diləyirlər. Allahdan başqa onları kim bağışlaya bilər? Gördükləri işi bildikdə bir daha ona qayıtmazlar"** (Ali-İmran, 135).

Başqa rəvayətlərdə günahları təmizləyən iki rükət namazın başqa keyfiyyətlərindən də söhbət açılır. Biz onları qısa şəkildə qeyd edək:

1) Dəstəmaz alan adamın günahları onun dəstəmaz suyu dəyən əzalarından su ilə və ya sonuncu su damcısı ilə birlikdə çıxır.

Ən yaxşı dəstəmaz odur ki, "bismillah" kəlməsilə başlasın və sonra aşağıdakı zikrlər edilsin: "Şəhadət edirəm ki, vahid Allahdan başqa ibadət haqqına malik tanrı yoxdur, Onun şəriki yoxdur. Şəhadət edirəm ki, Məhəmməd Onun qulu və elçisidir. Pərvərdigara, məni tövbə edənlərdən et. Məni pak olmuşlardan et. Sübhanəkə! İlahi, Sənə həmdü-səna ilə şəhadət edirəm ki, Səndən başqa tanrı yoxdur. səndən məğfirət (bağışlanma-tərc.) diləyir, Sənə tövbə edirəm". (Dəstəmazdan sonra oxunan bu zikrlərin hər birinin əcri bö-

---

[16] Əl-Buxari.

[17] Səhihüt tərcib vət tərhib 1/284.

yükdür).

2) İqaməni edir və iki rükət namaz qılır.

3) Səhvə yol vermir.

4) Özü ilə danışmır. Özü ilə danışmamaq üçün diqqətini bir yerə toplayır.

5) Zikr və Allahdan qorxu namazı daha təsirli edir.

6) Sonra Allahdan məğfirət diləyir.

Nəticə:

1) Bütün keçmiş günahlar bağışlanır.

2) Cənnət bu adam üçün vacib olur[18].

Bundan sonra çoxsaylı xeyirxah əməllər və itaət gəlir. Görmürsənmi ki, Ömər ibn əl-Xəttab (Allah ondan razı olsun!) Hüdeybiyyə vuruşu vaxtı Allah peyğəmbəri (s.a.v.) ilə mübahisə etdikdə öz səhvini başa düşür və deyir ki, bunu biləndə günahımı yumaq üçün xeyir əməllər etdim. Aşağıdakı səhih hədisdə verilən misal barədə dərindən düşün. Peyğəmbər (s.a.v.) demişdir: *"Pis işlərdən sonra yaxşı işlər görən adam dar, onu boğan zirehli paltar geymiş kimidir. Hər dəfə bir xeyirxah iş görəndə zirehdən bir həlqə açılır və axırda adam azad olur"*[19].

Xeyir əməllər günahkarı asilik məhbəsindən azad edir, onu gen-bol itaət dünyasına çıxarır. Aşağıdakı ibratəmiz hekayəti qısaca, qardaşım, sənə təqdim edirəm:

İbn Məsud (Allah ondan razı olsun!) demişdir: *"Bir nəfər Peyğəmbərin (s.a.v.) yanına gəlib deyir:*

*Bostanda bir qadın gördüm. Onunla hər işi gördüm, amma yaxın əlaqədə olmadıq. Onu öpdüm, qucaqladım. Bundan artıq heç nə etmədim. Nə istəyirsən et mənimlə!*

*Peyğəmbər (s.a.v.) kişiyə heç nə demir. Kişi çıxıb gedəndə Ömər deyir:*

*-Əgər o öz eybini gizlətsəydi, Allah da gizlədərdi).*

Peyğəmbər (s.a.v.) kişinin ardınca baxa-baxa dedi:

*-Onu geri çağırın!*

*Kişi qayıtdı. Peyğəmbər bu ayəni ona oxudu*: **"Gündüzün iki hissəsində və gecənin bəzi vaxtlarında namaz qıl. Həqiqətən yaxşı əməllər pisləri təmizləyir. Bu, Allahı zikr edənlər üçün öyüd-nəsihətdir"** (Hud, 114).

*Müazın başqa bir rəvayətində Ömər soruşur:*

*-Ya Rəsulullah! Bu yalnız ona aiddir, yoxsa bütün insanlara?*

*Peyğəmbər (s.a.v.) deyir:*

*-Bütün insanlara!"*[20].

---

[18] Səhihül tərcib 1/94-95.

[19] Ət-Təbərani. Səhihül Camii 2192.

[20] Müslimin rəvayəti.

## PİS ADAMLAR MƏNİ TƏQİB EDİRLƏR

Ola bilsin desinlər: Mən tövbə etmək istəyirəm.

Amma mənim dostlarımdan olan pis adamlar hər yerdə məndə hər hansı bir dəyişiklik barədə eşidəndə üstümə qızğınlıqla hücuma keçir, mən isə zəiflik hiss edirəm. Mən nə etməliyəm?

Sənə deyirik: Döz, bu, Allahın bir sınağıdır ki, öz bəndələrini ona çəkir. Bununla sadiq olanları yalançılardan ayırır, xəbisi yaxşıdan fərqləndirir.

Madam ki, yolun başlanğıcındasan, sabitqədəm ol! İnsan və cinlərdən olan bu cür şeytanlar bir-birini səni geri qaytarmağa sövq edirlər, sənsə onlara uyma! Onlar əvvəlcə sənə deyəcəklər ki, bu, keçici bir maraqdır, tezliklə ötüb keçəcəkdir. Bu, keçici bir böhrandır. Təəccüblüdür ki, bəziləri yoldaşlarından birinə tövbənin başlanğıcında hətta demişlər: Görəsən bu bədbəxtə nə oldu?!.

Qəribədir ki, bir qızın dostu daha çox günaha yol verməmək üçün tövbə etdiyindən onunla telefon əlaqəsini kəsdi. Amma qız bir müddətdən sonra yenə oğlana zəng etdi və soruşdu: Görəsən bu vəsvəsələr səni tərk etdilərmi?

Allah-təala buyurur: **“De: Pənah aparıram insanların Rəbbinə; İnsanların ixtiyar sahibinə; Vəsvəsə verən (Allahın adı çəkiləndə isə qorxusundan) qaçıb gizlənən Şeytanın şərindən - O şeytan ki, insanların ürəklərinə vəsvəsə salır. O şeytan ki, cinlərdən də olur, insanlardan da!”** (ən-Nas, 1-6).

İtaətdə sənin Rəbbin üstündür, yoxsa pislik nədimləri?!

Sən bilməlisən ki, bu adamlar hər yerdə səni izləyəcəklər, səni hər vasitə ilə biabırçılıq yoluna döndərməyə çalışacaqlar. Biri mənə danışmışdı ki, tövbə edəndən sonra məscidə gedərkən onun keçmiş qadın tanışlarından biri öz sürücüsünə maşını onun arxasınca sürməyi əmr etmiş, özü də pəncərədən onunla danışırmış.

Burada Allahın buyuruğu yerinə düşür: **“Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə (şəhadət kəlməsi ilə) sabitqədəm edər”** (İbrahim, 27).

Onlar sənə keçmişi xatırlamağa, sənin keçmiş günahlarının xoş mənzərəsini yaratmağa çalışacaq, müxtəlif yollara, vasitələrə, təsvirlərə, və sitatlara əl atarlar.

Onlara boyun əymə, özünü onlardan qoru, onlara aldanmaqdan çəkin. Burada məşhur səhabə Kəb ibn Malikin hekayətini xatırlamaq yerinə düşərdi.

Peyğəmbər (s.a.v.) əshabələrin hamısına Kəəb Təbuk döyüşündə kecikdiyinə görə onunla Allahın izni olana qədər əlaqəni kəsməyi əmr etmişdi. Qəssanilərin kafir şahı ona belə bir məktub yazır: “... Eşitmişəm ki, dostun səni incidir. Allah səni biabır və ağır bir vəziyyətə salmasın deyə, gəl, bizə qoşul. Haqq bizimlədir, sənə bunu məsləhət bilirik”. Kafir müsəlmanın düşdüyü vəziyyətdən istifadə etmək, onu Mədinədən çıxarıb küfr ölkəsinə çəkmək istəyirdi.

Bəs bu hörmətli səhabə nə etdi. Kəb belə deyir: “Bu məktubu oxuyanda dedim ki, bu da bir bəladır. Onu təndirə (ocağa) atıb yandırdım”.

Sən də, ey kişi və ya qadın müsəlman, sənə pis adamların göndərdiyi sifarişlərlə bu cür hərəkət et! Yandır göndərilənləri, qoy kül olsunlar. Bil ki, sən axirət odunun yandıracağı kəs ola bilərsən. **“Səbr et! Allahın verdiyi vəd haqdır. Qoy (axirətə) inanmayanlar səni yüngül hesab edib yerindən oynatmasınlar!”** (ər-Rum, 60).

## ONLAR MƏNİ HƏDƏLƏYİRLƏR

Tövbə etmək istəyirəm, amma keçmiş dostlarım pis əməllərimi camaat arasında yaymaqla, sirlərimi cəmiyyətdə aşkarlamaqla məni hədələyirlər. Onların əlində şəkillər, vəsiqələr vardır. Mən nüfuzum üçün qorxuram. Mən qorxuram!!

**Deyirik**: Şeytan övliyaları ilə vuruş, şeytanın yalançılıq torları zəifdir. Bütün bu sənə edilən təzyiqlər İblisin nökərlərinə aiddir. Bunlar həm də möminin səbri və səbatı qarşısında dağılmağa və puç olmağa davam edir. Onlara tabe olsan, onlarla birlikdə olsan, sənə daha çox bəhanələr gətirirlər. Amma əvvəl-axır zərər çəkən sənsən! Lakin sən onlardan çəkinmə, onlardan qorunmaq üçün Allahdan kömək dilə. Belə de: Mənə Allahın himayəsi bəsdir, O ən yaxşı himayəçidir! Peyğəmbər (s.a.v.) qorxu hiss edəndə deyərdi: *“Pərvərdigara! Səni onların başı üstə qoyur, şər işlərindən qorunmaq üçün Səndən kömək diləyirik”*.[21]

Doğrudan da ağır vəziyyət yaranır. Bir də görürsən, şər adam zəng edib tövbə edən yazıq bir qızı hədələyərək deyir: “Sənin danışıqlarını lentə yazmışam, şəkillərin əlimdədir. Əgər mənimlə gəzməyə getməsən, onları ailənə göstərib səni biabır edərəm!!” Doğrudanda onun vəziyyəti həsəd aparılası deyildir!

Bax, gör, tövbə edənlə şeytan nökərləri olan müğənnilər, artistlər necə müharibə edirlər! Onlar özlərinin ən murdar əsərlərini bazarlara çıxarıb psixoloji müharibə şəraiti yaradırlar. Lakin Allah möminlərlədir, tövbə edənlərlədir. Allah möminlərin himayəçisidir. Onlarıköməksiz qoymaz, onları tək qoymaz. Ona sığınan bəndə heç vaxt peşman olmaz. Bil ki, hər bir ağırı yüngül əvəz edir. Darlıqdan sonra genişlik gəlir.

Tövbə edən qardaşımız, bu təsirli hekayə dediklərimizin doğruluğuna misaldır: Bu hekayə möhtərəm səhabə, zəif və aciz müsəlmanları gizli yollarla Məkkədən Mədinəyə qaçıran Mərsəd ibn Əbu Mərsəd əl-Ğənvinin fədakarlığına aiddir:

“O, Mərsəd ibn Əbu Mərsəd adlı bir adam idi. Ailələri Məkkədən götürüb Mədinəyə gətirərdi. Məkkədə Ənnaq adlı pozğun bir qadın yaşayırdı. Onun bir rəfiqəsi də vardı. Mərsəd Məkkənin Əsari tayfasından olan bir kişi ilə razılaşır ki,

---

[21] Əhməd və Əbu Davud. Səhihul Camii 4582.

onu aparsın. O bu barədə deyir: Aylı gecə vaxtı Məkkənin divarlarının birinin kölgəsində dayanmışdım. Bu vaxt Ənnaq gəlib divarın yanına düşən qaraltımın qarşısında durub mənim kölgəmə baxmağa başladı. Mənə tərəf baxanda onu tanıdım. O soruşdu:

*-Mərsəd?*

*Dedim ki, bəli, Mərsəddir.*

*-Xoş gördük. Gəlsənə, bu gecəni bizdə keçirəsən!*

*Mən dedim:*

*-Ey Ənnaq! Allah zinakarlığı haram etmişdir. Bu cavabı alan Ənnaq çağırdı:*

*-Ey çadır əhli! Bu kişi sizin əsirlərinizi qaçırıb aparır.*

Səkkiz nəfər üstümə cumdu. Mən Xəndəmə dağına tərəf (Məkkənin giriş qapısının yanındakı dağ) qaçdım. Onlar da dalımca düşdülər. Mən qaçıb bir mağarada gizləndim. Gəlib başımın üstünü aldılar. Lakin Allah onları zülmətə qərq etdi. Onlar geri qayıtdılar. Mən öz yoldaşımın yanına getdim. Onu belimə aldım. Ağır adam idi. Belimdə onu qamışlığa çatdırdım. Ayağındakı qandalları açdım. Yenə də onu belimə götürdüm, məni çox yordu. Güclə onu Mədinəyə çatdırdım. Allah Peyğəmbərinin (s.a.v.) yanına gəlib dedim:

*-Ya Rəsulullah! Ənnaqın kəbinini kəsimmi?*

*Bunu iki dəfə dedim:*

*Allah Peyğəmbəri (s.a.v.) susdu, mənə cavab vermədi. O vaxta qədər ki, bu ayə nazil oldu:*

**"Zinakar kişi yalnız zinakar və ya müşrik qadınla evlənər. Zinakar qadın yalnız zinakar və ya müşrik kişiyə ərə gedər"** (ən-Nur, 3). *Peyğəmbər (s.a.v.) dedi: Ey Mərsəd! Zinakar kişi yalnız zinakar və ya müşrik qadınla evlənər. Zinakar qadının kəbinini yalnız zinakar və ya müşrik kişi kəsər".*[22]

Görürsənmi, Allah iman sahiblərini, necə müdafiə edir və əməlisalehlərlə necə davranır?

Ən pis vəziyyətdə, çəkindiyin bir iş baş verdikdə, bəzi şeylər aşkar olduqda və açıqlanmaya ehtiyac duyulduqda öz mövqeyini başqaları üçün tamamilə aydınlaşdır, onlarla açıq danış. Açıqca de: Bəli, günahkar idim, amma Allaha tövbə etdim. Siz nə istəyirsiniz? Hamıya bildir ki, həqiqi biabırçılığa insan Allah-təalanın hüzurunda qiyamət günü məruz qalır. Bu ən böyük xəcalət günüdür. Bu xəcalət heç də yüz, iki yüz, min, iki min adamın qarşısında deyil, bu ittiham şahidlərinin, bütün məxluqat-həm mələklər, həm cin, həm də Adəmdən başlayaraq sonuncuyadək bütün insanlar qarşısında olacaq rüsvayçılıqdır.

Budur İbrahimin çağırışı:

---

[22] Ət-Tirmizi. Səhihul Sünən 3/80.

“**İnsanların dirildiləcəyi gün (qiyamət günü) məni zəlil, rüsvay etmə! O gün ki, nə mal-dövlət, nə də övlad bir fayda verər!**” (əş-Şüara, 87-88).

Ən böhranlı dəqiqələrdə aşağıdakı nübüvvət duasında özünə dayaq tap: *“Pərvərdigara! Çılpaq yerlərimizi ört, ürəklərimizə əmin-amanlıq bəxş et! Pərvərdigara! Bizə zülm edənlərdən intiqam almaq imkanı ver, bizə qarşı çıxanlara mübarizədə bizə kömək ol!*

*Pərvərdigara! Düşmənlərimizi və bizə həsəd aparanları sən sevindirmə!”*.

## GÜNAHLARIM BÜTÜN VARLIĞIMI ZƏHƏRLƏMİŞDİR

Deyirsən: Mən çox günahlar etdim, sonra Allaha tövbə etdim. Lakin günahlarım məndən əl çəkmir, etdiklərimi yadıma salır, bütün həyatımı zəhərləyir, rahatlığımı əlimdən alır. Gecələrimi yuxusuz etmiş, sakitliyimi pozmuşdur. Bir çıxış yolu görmürəm.

Deyirəm: Müsəlman qardaş! Bunlar həqiqi tövbəyə dəlalət edən hisslərdir, həqiqi peşmançılıq əlamətləridir. Əgər keçmişlərə baxıb peşman olsan və buna rica gözü ilə yanaşsan, bunun özü elə tövbədir. Sən Allahdan rica edirsən ki, səni bağışlasın, Allahın bəxş etdiyi rahatlıq hissindən məyus olma, Allahın mərhəmətindən ümidini kəsmə. Allah-təala buyurur: **“[İbrahim] dedi: Haqq yolundan azanlardan başqa, Rəbbinin mərhəmətindən kim ümidini üzə bilər?!”** (əl-Hicr, 56).

İbn Məsud (Allah ondan razı olsun!) demişdir: “Ən böyük günahlar bunlardır: Allaha şərik qoşmaq, Allahın qəzəbindən özünü qorunmuş bilmək, Allahın mərhəmətindən ümidini kəsmək, Allahın bəxş etdiyi rahatlıqdan məyus olmaq”.[23]

Mömin bəndə Allahın hüzuruna qorxu ilə rica arasından keçən bir yolla gedir.

Bu hisslərdən hər biri müəyyən anda üstün gələ bilər. Belə ki, günah etdiyi vaxt qorxu hissi keçirib tövbə etməlidir. Tövbə etdikdə rica hissi üstün olub Allahdan bağışlanma diləməlidir.

## ETİRAF ETMƏLİYƏMMİ?

Bir nəfər həzin bir səslə soruşur: “Tövbə etmək istəyirəm. Amma, gedib bütün günahlarımı etiraf etməyim vacibdirmi? Məgər tövbə etməyim üçün məhkəmədə qazinin qarşısında bütün etdiklərimi etiraf etməliyəm, şəriət qanunlarını mənə qarşı tətbiq etməyi tələb etməliyəm?”

Yuxarıda verdiyimiz Maiz və qadın və ya bostanda qadını öpən kişi hekayələrinin mənası nədir?

---

[23] Əbdürrəzzaq, əl-Heysəmi və İbn Kəsir.

Müsəlman qardaşım, sənə bunları deyirəm:

Bəndənin hər hansı aralıq vasitə olmadan Rəbbi ilə əlaqəsi ən böyük tovhiddir. Bunu Allah-təala da razılıqla qarşılayır: **“Bəndələrim Məni səndən soruşduqda söylə ki, Mən onlara yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edirəm”** (əl-Bəqərə, 186).

Əgər tövbənin Allaha olduğuna əminiksə, onda etirafın da Allaha olduğunu qəbul etməliyik. Bağışlanma diləyənin duasında deyilir: “Mənə bəxş etdiyin nemətini Sənə qaytarıram, günahlarımı qaytarıram, günahlarımı qaytarıram”, yəni Allahın qarşısında onları etiraf edirəm.

Allaha şükür ki, xristianlar kimi deyilik. Bir kürsüdə oturursan keşişin qarşısında. Günahlarını etiraf edirsən. “Sən bağışlandın” deyir və sair bu kimi oyunlar...

Amma Allah buyurur: **“Məgər bilmirlər ki, Allah bəndələrinin tövbəsini qəbul edir”** (ət-Tövbə, 104). Yəni heç bir vasitəçi olmadan birbaşa bəndələrdən tövbəni qəbul edir.

Şəriət qanunlarının tətbiqinə gəlincə deməliyik ki, əgər günah imam, hakim və yaxud qazi üçün aşkar deyilsə, onda insanın gəlib onları etiraf etməsi gərək deyildir. O şeyi ki, Allah gizli saxlayır, onu insanın özü də gizli saxlaya bilər. Tövbə ona bəs edər, onunla Allah arasında bu tövbə kifayətdir. Sübhanəhu təalanın gözəl adlarından biri də Sittirdir. (Səttar-örtən, gizlədən, yəni eyibləri örtən, gizlədən-tərc.) O, bəndələrin eyiblərini gizlədir. Bəndələrsə, məsələn zina edən Maiz və qadın, bostanda qadını öpən kişi kimi səhabələrsə (Allah ondan razı olsun!) onlar üçün vacib olmayan bir işi gördülər. Onlar bunu daha çox paklanmaq üçün etdilər. Bu dəlil odur ki, Maiz və qadın onun yanına gələndə Peyğəmbər (s.a.v.) bir söz deməkdən çəkindi. Həmçinin Ömərin də bostanda qadını öpən kişi barədə dediyi də bu qəbildəndir. Onun özü öz eybini gizlətsə, Allah da onu gizlədər. Peyğəmbər (s.a.v.) də məhz buna görə susmuşdu.

Buna görə etirafları rəsmi şəkildə qeyd etdirmək üçün heç də məhkəməyə getmək lazım deyildir. Həmçinin məscidin imamının qəbuluna gedib ondan şəriət qanunlarının tətbiqini tələb etmək də lazım deyildir. Bu işdə evdə həyat yoldaşından da kömək diləmək yersizdir. Bunu bəziləri güman edirlər.

Bu halda bəzi nadan tövbə edənlərin aşağıda verilən hekayətdə qısaca təsvir edildiyi kimi necə abırsız vəziyyətə düşdüklərini öyrənə bilərsən:

Bir nəfər günahkar nadan bir məscidin imamının yanına gəlib günahlarını etiraf edir və ondan məsələyə həll tələb edir. Bu İmam deyir ki, əvvəlcə məhkəməyə gedib öz etiraflarını rəsmi şəkildə qeydiyyata salmalısan və sonra qanunlar tətbiq edilməklə sənin məsələnə baxılacaqdır. Yazıq görəndə ki, bütün bunları etmək imkan xaricindədir, o, tövbədən əl çəkir və öz əvvəlki əməllərinə qayıdır.

Bu fürsətdən istifadə edib belə bir mühüm mülahizəni söyləyirəm: Siz ey

müsəlmanlar! Din ehkamlarını bilmək əmanətdir. Onu həqiqi mənbələrindən öyrənməyin özü də əmanətdir. Allah-təala buyurur: **“Bilmədiyiniz şeylər barədə zikr edənlərdən (kitab əhlindən) soruşub öyrənin”** (ən-Nəhl, 43), həmçinin: **“Bunu hər şeydən xəbərdar olan Rəhmandan soruş!”** (əl-Furqan, 59). Heç də hər bir vaiz fətva vermək səlahiyyətinə malikdir. Heç də hər bir məscid imamı və ya müəzzin insanların problemləri barədə şəriət hökmləri verə bilər. Nə də hər bir ədib və ya qazi fətva daşıyıcısıdır. Müsəlman fətva verdiyi şəxsə görə məsuliyyət daşıyır. Bu, iman məsələsidir. Peyğəmbər (s.a.v.) müsəlman ümmətini yalançı imamlardan çəkindirmişdir. Sələflərdən biri deyir: Bu elm bir borcdur: Bax, gör, bu borcu kimlər götürürlər. Allah bəndələrini bu işdə sürüşməkdən qoruyur, rastlaşdığınız problemlər barədə elm adamlarından soruşun. Allah imdadınıza çatar!

**SON OLARAQ**

Ey Allah bəndəsi, Allah tövbə qapısını üzünə açmışdır. Məgər daxil olmazsan? “Tövbənin bir qapısı vardır, şərqlə qərb arasındakı məsafə qədər aralıdır. (Başqa rəvayətdə: eni 70 il yol qədərdir). Bu qapı gün batdığı yerdən çıxana qədər bağlanır”.[24]

Allah-təala buyurur: **“Ey bəndələrim! Siz gecə və gündüz səhv edirsiniz. Mən günahları bütünlüklə bağışlayıram. Məndən bağışlanma diləyin, Mən sizi bağışlayaram**”[25]. Məgər bağışlanma diləməzsən?

Allah-təala gecələr əlini uzadır ki, gündüz günah edən onu tutub tövbə etsin, gündüz əlini uzadır ki, gecə günah edən onu tutub tövbə etsin. Allah üzr diləməyi sevir, məgər üzr diləmirsən?

Allah haqqı, tövbə edənin bu sözləri nə şirindir:

Sənin qüdrətinlə, Sənə üz tuturam, öz zəifliyimi bildirirəm, Mənə rəhm et. Sənin sərvətin qarşısında kasıblığımı bildirirəm. Bu xətalar sahibi yalançı bəndən Sənin qarşında durub. Mənim Səndən başqa sahibim yoxdur. Mənə Səndən başqa sığınacaq və ümidgah yoxdur. Sənə bir miskin kimi üz tuturam, aldadılmış zəlil adam kimi Sənə dua edirəm. Bu Sənə itaət edənin, boyun əyənin, Sənin qarşında zəlil olanın, gözlərini yerə dikənin, qəlbi ilə Sənə müti olanın yalvarışıdır.

Aşağıda verilən hekayəti diqqətlə oxu və onun tövbə mövzusu ilə əlaqəsi barədə dərindən fikirləş:

Rəvayət edirlər ki, bir əməlisaleh adam yol gedirmiş. Yol üstə açıq bir qapı görür. Bu qapıdan ağlaya-ağlaya kömək diləyən bir oğlan uşağı çıxdı. Anası onu döyərək qovub evdən çıxartdı. Sonra qapını örtdü. Uşaq bir qədər qəm-qüssə içində gəzdi və çox fikirləşdi. Yenə bayaq qovulduğu evdən başqa bir sığınacaq yeri tapa bilmədi. Anasından başqa heç kəs ona sahib durmazdı. Qəlbi sınmış, qəm və kədər içində geri döndü. Amma qapı bağlı idi. Başını qapının astanasına

---

[24] Ət-Təbarani “əl-Kəbir” (Səhihül Camii 2177).

[25] Müslimin rəvayəti.

qoyub yuxuya getdi, göz yaşları da yanaqlarına axmışdı. Bir qədər sonra anası bayıra çıxdı. Uşağı bu vəziyyətdə görəndə davam gətirmədi, özünü onun üstünə atıb o üz-bu üzündən öpə-öpə və ağlaya-ağlaya bunu dedi:

-Oğlum, hara gedəcəksən, məndən başqa sənə kim sahib duracaq. Sənə demədim, sözə bax, səni cəzalandırmağa məni məcbur etmə. Halbuki Allah məni sənə münasibətdə rəhm və şəfqət hissi ilə yaratmışdı.

Bundan sonra uşağı götürüb içəri apardı. Lakin Peyğəmbər (s.a.v.) bu hekayə barədə demişdir: *"Allah öz bəndələrinə münasibətdə bu qadının uşağına münasibətindən qat-qat mərhəmətlidir"*.[26]

Hər şeyi əhatə edən Allahın mərhəməti hara, bu ananın mərhəməti hara!

Bəndə Ona tövbə etdikdə Allah fərəh hissi keçirir. Fərəhlənən Rəbbdən xeyir əskik olmaz.

"Allah-təala bəndəsi Ona tövbə etdiyi zaman son dərəcə sevinir. Bir kişi bir ölkəyə səfərə çıxmışdı. Təhlükəli bir yerdə mənzil qurdu. Üstündə yeməyi və içməyi olan dəvəsi də onunla idi. Bir ağacın kölgəsinə sığındı. Başını qoyub yatdı. Yuxudan ayılanda gördü ki, dəvə və üstündəki azuqə yoxa çıxıbdır. Yaxınlıqdakı təpəyə qalxıb ətrafa baxdı, amma bir şey görmədi, başqa bir təpədən də baxdı, yenə bir şey görmədi. Nəhayət, istilik və susuzluq onu əldən saldıqda bunları dedi:

-Gedirəm bayaqkı yerimə, uzanıb yatıram ki, ölüm, canım qurtarsın.

Yenə ağacın altına gəldi, onun kölgəsində uzandı. Dəvəsindən çox incik halda, özü də əzab-əziyyət içində yuxuya getdi. Gözlərini açanda dəvəsini üstündəki azuqəsi və içkisi ilə birlikdə gördü. Dəvənin cilovunu tutdu. Amma Allahın Öz bəndəsinin tövbəsindən duyduğu sevinc hissi bu kişinin dəvəsini və azuqəsini tapmaqdan keçirtdiyi sevinc hissindən qat-qat güclüdür".[27]

Qardaşım, bilməlisən ki, günah, sidqi ürəkdən tövbə edən şəxsi Allah-təalanın qarşısına sınmış və peşman olmuş bir vəziyyətə salır. Aləmlərin rəbbi Allah tövbə edənlərin ağlamasını sevir. Günahdan sonra tövbə itaətə, çoxsaylı xeyirxahlığa çevrilir. Hətta şeytan belə həsədlə baxıb deyir: "Kaş mən onu bu günaha batırmayaydım". Buna görə də bəzi tövbə edənlərin günahdan sonra qəlbi daha saf olur.

Allah-təala heç vaxt Ona üz tutub tövbə ilə gələn bəndəsini tək qoymur. Bir uşaq öz atasının himayəsində yaşayırmış. Ona ən yaxşı və ən dadlı yemək və içmək verilir, ən gözəl tərbiyə görür, cib xərcliyi alır, ata övladın mənafeyinin keşiyində durur. Bir gün ata övladını bir ehtiyaca görə göndərir. Yolda onun üzərinə düşmənlər hücum edir, əsir götürüb qol-qıçını bağlayıb qandallayırlar. Onu düşmən ölkəsinə aparırlar. Onunla atasının davrandığının tam əksi olan bir

---

[26] Müslimin rəvayəti.

[27] Səhih rəvayətlər məcmusu. Səhihül Camii. 4/368.

tərzdə davranırlar. Uşaq həmişə atasının tərbiyəsini, yaxşılığını yada saldıqca qəlbi təlatümə gəlir, həsrət odu ilə yanırdı. Keçmiş günlərini, içində böyüdüyü naz-neməti unuda bilmirdi. Əsirlikdə olan uşağa düşmən ən ağır əziyyətlər verirdi, axırda onun başını kəsmək niyyətində idi. Bir dəfə təsadüfən əsir öz torpağına tərəf baxanda gördü ki, atası onun yanındadır. Ata uşağa tərəf atılıb onu qucaqladı. Uşaq atanın qabağında yerə yıxılıb ağaya-ağlaya deyirdi: "Ata, atacan, atacan! Oğluna bax, gör, nə gündədir". Uşağın gözlərindən yaş axırdı. Uşaq atasını qucaqlamışdı. Ata da övladını ağuşuna alıb bağrına basmışdı. Düşmən uşağı tələb edərək atanın başı üstə durmuşdu. Uşaq bərk-bərk yapışmışdı. Deyirsən yəni ata öz övladını bu vəziyyətdə düşmənə təslim edər, onu qoyub gedər? Görəsən bəndəsinin mərhəməti atanın öz övladına mərhəmətindən, həm də övladın ataya mərhəmətindən qat-qat artıq olan Allah barədə nə fikirdəsən? Bəndə Ona sığınanda, düşməndən qaçıb Ona üz tutanda, özünü Onun qapısının ağzına atanda, göz yaşlarından islanmış yanaqlarını cıraraq Onun qarşısında ağlaya-ağlaya deyir: Ya Rəbb! Səndən başqa rəhm edəni olmayana, Səndən başqa kömək edəni olmayana, Səndən başqa sığınacağı olmayana, Səndən başqa yardım edəni olmayana, miskininə, fəqirinə, dilənçinə rəhm et!

Sənsən onun ümidi, Sənsən onun pənahı. Səndən Sənin özünə pənah gətirməkdən başqa sığınacaq və xilas yoxdur. Buyur, xeyir əməllərə, ehsanata, savab əldə etməyə! Əməlisalehlərin yaxınlığına, haqq yolundan azmaqdan qorunmağa, hidayətdən sonra yol azmaqdan qaçmağa aparan doğru yola, buyur! Allah səninlədir. Allah Bağışlayan və Rəhm Edəndir!